*© "Metafizika" Journal* *p-ISSN 2616-6879*
*Vol 6, issue 1, serial 21, 2023. pp.185-197* *e-ISSN 2617-751X*

**UOT:** 37.01.
**KBT:** 74.200.51
**MJ №** 162

# Mənəvi dəyərlərin ictimaiyyətdəki rolu və Heydər Əliyevin mənəviyyat fəlsəfəsi

**Əhməd Niyazov***

**Abstrakt.** İnsan həm maddi, həm də mənəvi dünyası arasında əlaqə qurmalı və bu iki dünya arasında harmoniya quraraq bu ahəngi yaşatmalıdır. Bu mənada insanın bir mənəviyyat fəlsəfəsinin olması labüddür. Çünki mənəvi dəyərlər fərddən topluma, dövlətdən tarixə, iqtisadi nizamdan incəsənətə və dinə qədər uzanan fikir və düşüncələrin üstündə bir fanus kimi durur.

Sosial münasibətlərin qurulmasında insanların tabe olmaq məcburiyyətində olduğu dəyərlər və normlar ictimai həyatda insanın mənəviyyat fəlsəfəsini təşkil edir. Müasir insan modeli, yaxud şəxsiyyəti üçün bu ehtiyacı təmin edən qaynaq insanın yaşadığı cəmiyyətin tarixi, ədəbiyyatı, mədəni-dini ənənəsidir. Məşhur tarixçi alim Bernard Levisin dediyi kimi: *"Bəşər tarixində sosializm, kapitalizm kimi siyasi ideologiyalar insana arzu edilən formada heç bir şey təqdim etmədiyi üçün XXI əsrin insanı xoşbəxtliyini özünün tarixi köklərində axtaracaq"*. Məhz bu səbəblədir ki, türk dünyasında ümumiyyətlə son dövrlərdə "mənəviyyatın ənənəvi qaynaqlarını modern zamanın imkanları ilə gözdən keçirmək üçün insanlarımızın fəlsəfi düşüncə tarixinə müraciət etməsi zərurəti" əsas prinsip kimi səsləndirilmişdir. Mənəviyyatı və əxlaqı dövlətin ünsürlərindən sayan fəlsəfə alimi Nurəddin Topçu belə qeyd edir: *"Əxlaq və mənəviyyat qaynağını dindən alır. Buna görə də əxlaq İslam dininin əsası və bilavasitəözüdür. Əxlaqı dindən və ya dini əxlaqdan ayrı görmək istəyənlər, insanın daxili aləmini onun özündən ayrı görmək istəyənlərdir"*.

* İlahiyyat üzrə fəlsəfə doktoru, dosent,
Azərbaycan İlahiyyat İnstitutu "İslamşünaslıq" kafedrasının müdiri; Bakı, Azərbaycan
E-mail: ahniyazov@hotmail.com
https://orcid.org/0000-0001-8164-2184

**Məqaləyə istinad:** Niyazov, Ə. [2023] Mənəvi dəyərlərin ictimaiyyətdəki rolu və Heydər Əliyevin mənəviyyat fəlsəfəsi. *"Metafizika" jurnalı, 6(1),* səh.185-197.

**Məqalənin tarixçəsi:**
*Məqalə redaksiyaya daxil olmuşdur: 20.01.2023*
*Təkrar işlənməyə göndərilmişdir: 21.02.2023*
*Çapa qəbul edilmişdir: 13.03.2023*

Bu fəlsəfi yanaşmanın ümummilli lider Heydər Əliyevin XXI əsrdə Azərbaycan xalqının bir xalq kimi formalaşmasında əsas meyar olaraq qəbul etdiyini rahatlıqla deyə bilərik. O deyirdi: *"Heç vaxt inamımızdan, dinimizdən uzaqlaşmayacağıq və bu mənəvi mənbələrimizdən istifadə edərək gələcəyimizi quracağıq!*". Bu və ya digər şüarları ilə bir lider kimi o, hər platformda fəlsəfi düşüncə tariximizin zəngin olduğunu və müasir imkanlar möhtəvasında bunun əldə edilməsi və hayata kəçirilməsinin asan olduğunu vurğulayırdı. Məqalədə ümumilikdə mənəviyyat fəlsəfəsi və Heydər Əliyev konteksti əks edilib.

**Açar sözlər:** insan, mənəviyyat, Heydər Əliyev, kontekst, sivilizasiya, din

## 1.Giriş

İnsan ruhdan və bədəndən ibarət bir varlıqdır. İki məfhumdan biri maddi, digəri isə mənəvidir. Məlumdur ki, hər ikisinin özünəməxsus xüsusiyətləri mövcuddur. Ruhun varlığı izafidir. Bu baxımdan özü də mənəvi olan ruhun substansionallığı da mənəvidir. Ontoloji və qnesoloji aspektlər də daxil olmaqla insanın əxlaqi, estetik, intellektualıq və sair bu kimi praktik ünsürləri onun mənəviyyat fəlsəfəsini təşkil edir. Fərdi əxlaqi-mənəvi prinsiplər əsas olaraq insanın şəxsi keyfiyyətini müəyyənləşdirən və yaxud formalaşdıran amillərdəndir.

İnsanın həyatı rüşeym dövründən başlayaraq insan formasında təşəkkülü və uşaqlıqdan gənclik dövrünə və gəncliyindən ahıl yaşlarına qədər mərhələli olaraq həmşə inkişaf edərək davam edir. [Osman N. Küçük, 2015. s.15; Leo Buscaglia, 1987. s.35]. Bəşər övladının bu xüsusiyyəti, yəni dəyişkənlik əlaməti insan həyatının səciyyəvi xarakteridir. Mənəvi kamillik istiqamətində insan həyatı həmişə dəyişkən xarakterə malikdir. İlk dövrün məşhur yunan filosoflarından Herakleitosun *"Həyatda dəyişməyən tək şey, dəyişkənlik özüdür"* fəlsəfi yanaşması göstərir ki, hələ qədim dövrlərdən düşüncə və təsəvvürlərdə insan həyatının istər yaşa dolması ilə paralel fiziki baxımdaan, istərsə də insan idrakının inkişaf dinamikası baxımından dəyişkənliyi labüdlük kategoriyasında götürülmüşdür. İnsanın fəal istiqamət götürməsi, hərəkət dairəsində aktiv fəaliyyət göstərməsi onda fitridir və ruhani aləmində həmişə mənəviyyat fəlsəfəsindən çıxış etmə təmayülü göstərir. Mənəvi dəyər fərdi şüurlarda prinsipiallıq meydana gətirərək insanın düşüncə və təsəvvürlərini

## 2.Mənəvi dəyər və onun ictimai rolu

Dəyərlər insanlararası münasibətlərdə əhəmiyyət kəsb edən amildir. İnsanlar bir-biri arasında onunla ünsiyyət qururlar. İnsan sözünün bir mənası da "üns" kökündən ünsiyyət quran məna daşıdığı qeyd edilir [İlhan Kutluer

2000. s.320-323]. Çünki insan sosial bir varlıq kimi digər insanlarla birlikdə yaşamaq məcburiyyətindədir [Ruhattin Yazoğlu, 2014. s.6-15]. Bu birgəyaşayışın labüdlüyü insanlar arasında qruplar meydana gəlməsinə səbəb olur ki, həmin qruplar ictimai nizamla idarə olunurlar.

Toplum dizayn ünsürləri arasında əxlaq dəyərlərini ehtiva edən ən önəmli komponent mənəviyyatdır. O, bəşər tarixi boyu insanla birlikdə var olub, hər dövrün şəraitinə uyğun formalaşmış və yaxud öz dövrünün düşüncə tərzinə görə dəyişərək inkişaf etmişdir.

Bu nizam sosial dəyərlərdən ibarətdir. Arzu edilən və bəyənilən etik davranışları ifadə edən mənəvi dəyərlərin əvvəlcə terminaloji əsasını sonra isə ictimai rolunu aşağıdakı kimi aydınlaşdırmaq olar.

**2.1.Dəyər sözünün terminaloji əsası**

Dəyər mövzusu sosialogiya elmində ən çox istifadə edilən terminlərdən olsa da hələ də onun haqqında tədqiqatların davam etdiyi qeyd edilir. [Yazıcı Mehmet, 2014. c.24, sayı.1, s.209-223]. Bu mövzu həm fəlsəfə və həm də sosialogiya sahəsinin ictimai həyatla bağlı tədqiqi məsələlərini ehtiva edir. Mənəvi dəyərlər insanlararası ünsiyyətin qurulması baxımından ictimai həyatın əsas komponentlərindən sayılır və toplumun özəyini təşkil edir. İctimai nizamın təşkili və toplumda dizayn ünsürlərinin təminində də rolu böyükdür.

Şübhəsiz dünyanın və həyatın mənası və anlamı olmasının əsas faktoru insandır. Necə ki, dəyərin çıxış nöqtəsi və mənbəyi insandır. Onun başlanğıcı da insandır. Bu baxımdan insan, qurub yaratması ilə, istehsal etməsi və istehsal vasitələri ilə həyatın mənası meydana gəlir. Məhz bu səbəblə demək olar ki, insansız həyatın mənası yoxdur. İnsan dünyasının da bir həqiqəti vardır ki, o da dəyərdir. [Hüseyin Tepe, 2009. s.26]. Həyatla qurub yaratdılanlar arasındakı dəyər insanın özüdür və insan dünyasının da gerçəyi odur.

İnsan özü özünə dərk olunmuş bir dünya qurur [19 (31.01.2023)]. İdrakın prednmeti olan hər bir şeyə müəyyən dəyər biçilmiş olur. İstər ətraf mühitin təşəkkülü olan əşyalara, istərsə də ətrafında baş verən hadisələrə münasibət bildirən insan hər şeyə öz təvəccühü ilə yanaşır. O, dəyərlərdən ibarət mütəşəkkil bir mənəvi dünya meydana gətirir.

Dəyər məfhumunun hansı tərkiblə məna qazandığı əhəmiyyət kəsb edən məsələdir. Bir məna yükləməsi olmasa bir şey dəyər olmaz. Həmin dəyərin meydana gəlməsi üçün məna yükləyən isə insan amilidir. Burdan çıxan nəticə odur ki, dəyər bir predmet kimi insan məfhumu ilə düz müənasiblik təşkil edir. Dəyərin varlığı insanın varlığına bağlıdır.

Digər cəhətdən əgər insan həmin şeyə hər hansı bir məna yükləməsə onda dəyərin varlığından söz gedə bilməz. Çünki dəyər izafidir. Həmçinin insan amili olmayan müstəqil bir dəyərin varlığını düşünmək də qeyri mümkündür. Ancaq onu da qeyd etmək lazımdır ki, dəyər məfhumu insan amilinə bağlı olduğu üçün insan kəmiyyəti dəyərin təsir edici amillərindəndir. Yəni dəyərlərin müxtəlifliyi insan foktoruna görə dəyişkəndir [19 (31.01.2023)].

Bundan başqa sosiologlara görə dəyərlər müəyyən xüsusiyyətlərə də malikdirlər. [Mehmet Yazıcı, 2014. c.24, sayı.1, s.212]. Məsələn onlar fərdlər arasında bölüşmək, digəri tərəfin fərqində olduğu, nəsildən nəsilə fərddən fərdə simvollarla ötürülən, mücərrəd, yaxud dəyişkən olan və eyni zamanda ictimailik kimi xüsusiyyətlərə malikdirlər. Bunların da öz növbəsində müvəqqəti və daimilik kimi xüsusiyyətləri olmaqla yanaşı hər birinin müəyyən ictimai funksiyalarını da qeyd etmək mümkündür.

**2.2.Mənəvi dəyərlərin ictimai rolu**

Məlumdur ki, ictimaiyyət özü həm maddi və həm də mənəvi ünsürlərdən meydana gəlir. Bunların ən başlıca sosial dəyərlərdir. Sosial dəyərlər ictimaiyyətdə aparıcı rola sahibdirlər. İctimai quruluşlarda adət-ənənə, ailə, təlim-tərbiyə və hətta iqdisadiyyat kimi sosial kompanentlərin sosial dəyərlərlə birbirinə bağlı və birbirindən təsirlənən iki yönlü əlaqələri mövcuddur. Qeyd edək ki, sadalanan bu kompanentlər həm dəyərləri ifadə edir, həm sosial dəyərlərdən güc alır [Enver Özkalp, 2003. s.21] həm də bir baxıma ictimai nizamın funksiyanallığını təmin edirlər. Beləliklə mənəvi dəyərlər sosial münasibətlərin inkişafında mühüm rol oynayır.

Həmçinin hər bir dəyər ictimaiyyətin təsir vasitəsi kimi çıxış edir. Eyni zamanda ailə, təlim-tərbiyə, din və sair kimi sosial elementlər bu dəyərlərin yaşanmasında, yayılmasında və gələcək nəsillərə ötürülməsində aktiv rola malikdirlər. Burdan aydın olur ki, həm dəyərlərin ictimai təsiri, həm də ictimaiyətin dəyərlərə təsiri labüddür [Tepe, H. 2009. s.30].

Bu baxımdan qeyd etmək yerinə düşər ki, dəyərlər bir növ cəmiyyətin mənəvi simasını əmələ gətirir. Belə ki fərdin şüurunda arzu olunan, ictimai mənfəət əsaslı, faydalı və əhəmiyyətli dəyər kimi formalaşan davranışlar kütləviləşir və fəaliyyət prinsiplərinə çevrilərək cəmiyyətin strukturunu meydana gətirir. Eyni zamanda bu kimi yanaşmalar ideal düşüncənin imkanlarını göstərir, digər ictimai qruplara model bir nümunə kimi təsiredici qüvvəyə çevrilir və öz meyarlarını bundan sonra da inkişaf etdirir.

Fərdi şüurun ideyalarla kütləviləşməsi və fəaliyyət prisipləri ilə yüksək mənəvilik əsasında kökləşməsi cəmiyyətlər üçün labüddür [Əbu Turxanın hikmət dünyası. (31.01.2023)]. İctimai baxımdan bu iki məsələnin hər binin birbirinə paralel inkişafı şərtdir. Ancaq belə olan halda mənəvi ideal daha

dayanıqlı ola bilər. Həmçinin ictimai mühitin mənəvi siması məhz həmin şüurlu ideyaların kütləviləşməsini meydana gətirərək inkişaf edə bilər. Əks təqdirdə ictimai ruhun xəstəliyinin əks təsirləri digər fərdlərin də xəstə ruhundan əziyyət çəkə bilər və eyni zamanda ictimai deqradisiya hakim ola bilər.

Qeyd edilən yüksək mənəvilik ictimai prinsiplər meydana gətirdikdən sonra təbii olaraq həmin prisiplər ictimai bis sistemin əmələ gəlməsini təmin edir. İctimai nizamın əldə edilməsinin zəmini təşkil edir.

Hər bir ictimai formanın özünəməxsus mənəviyyat fəlsəfəsi və prinsipləri mövcuddur. Bu nüans eyni zamanda kortəbii ictimai quruluşların və yaxud xaotik qruplaşmaların olmayacaqlarını göstərir. Çünki bu xüsusiyyət, yəni mənəviyyat fəlsəfəsindən çıxış edərək həyatda qalma başarısı toplumların varlıq səbəbidir [Asım Yapıcı, 2012. c.11, sayı.42 s.135]. Onların mövcudiyyəti, yaxud həyatda varlıq göstərmələrinin zəruriliyi dəyərlər komponentindən kompleks formada istifadə etməkdir. Buradan aydın olur ki, mənəviyyat fəlsəfəsi toplumların, yaxud ictimai quruluşların təkcə ayaqda qalmaları yox, həm də onların gələcəyi üçün bir ehtiyacdır.

Bununla birgə əlavə etmək lazımdır ki, hər bir ictimai quruluş özlüyündə dəyişkənliyini qoruyaraq inkişaf edir. Öz istiqrarı və stabil funksiyasını ifa edə bilməyən toplumun dəyişkənliyini demək çətindir [Nihat Nirun, 1991. s.107].

İctimaiyyət həm də milli sərhədləri olan birlikdir. Millik onun tərkib hissəsisidir. Milliliyin atributlarını daşıyan toplumlar onu inkişaf etdirərək güclənir və varlıq nümayiş etdirir. Dəyərlər cəmiyətin mədəniyyətini formalaşdıran ünsürdür [Ali Seyyar, 1999. s.100-125]. Milli dəyərlərin hər topluma görə fərqli olması ilə yanaşı bu dəyərlər ictimai nizamı dəstəkləyəci funksiyası da əsas faktorlardan biridir.

Fərdlərlə başlayan mənəviyyat fəlsəfəsi ictimai nüfuza çevrildikdən sonra fərdi, yaxud başlanğıc mənbəyi olan fərdləri aşaraq ictimai təsir gücü meydana gətirir. Bundan sonra o toplumun ümumi dəyəri kimi varlığını davam etdirir. Artıq belə bir halda həmin dəyər fərdin, ya da fərdlərin malı kimi yox toplumun malı mövqeyindən çıxış edir. Fərddən topluma dəyər axışı meydana gəlir və dəyərlərin təkamülü gerçəkləşir. Müsəlman şərqin dahilərindən İbn Sina haqlı olaraq demişdir ki, ideal bir ictimai quruluş yaxud bir cəmiyyət ideal fərdlərdən meydana gəlir. Yəni ideal cəmiyyətin başlanğıcı mücərrəd ideal fərdin özündən qaynaqlanır. Çünki cəmiyyətin mənbəyi tək tək fərdlərin özüdür. [Dahi mütəfəkkir İbn Sina ideal cəmiyyət nəzəriyyəsində fərdi ideallaşdıran dəyər kimi onun məsuliyət sahibi olmasını

əsas göstərir. Belə ki, o ideal fərdin məsuliyyət alan fərd olduğunu vurğulayaraq onu ideal cəmiyyətin əsas atributlarından biri kimi göstərir].

**3.Heydər Əliyevin mənəviyyat fəlsəfəsi**

Sosial münasibətlərin qurulmasında insanlararası münasibətləri tənzimləyən dəyərlər və normlar ictimai həyatda insanın manəviyyat fəlsəfəsini təşkil edir. Müasir insan modeli, yaxud şəxsiyyəti üçün bu ehtiyacı təmin edən qaynaq insanın yaşadığı cəmiyyətin tarixi, ədəbiyyatı, mədəni-dini ənənəsidir. Həmin mədəni-dini ənənə xalqların kökündə duran ünsürləri ehtiva edir və həmişə milli mənsubiyəti və milliliyi özündə əks etdirir. Hər bir fərd həmin ənənədən bəhrələnərək özünü ifadə etdiyi kimi, qarşılaşdığı müşkil durumlarda da referans kimi məhz həmin qaynağa müraciət edir. Məşhur tarixçi alim Bernard Lewisin dediyi kimi:

*“Bəşər tarixində sosializm, kapitalizm kimi siyasi ideologiyalar insana arzu edilən formada heç bir şey təqdim etmədiyi üçün XXI əsrin insanı xoşbəxtliyini özünün tarixi köklərində axtaracaq”* [Bernard Lewis, 2020. s.79].

Məhz bu səbəbədir ki, türk dünyasında ümumiyyətlə son dövrlərdə “*mənəviyyatın ənənəvi qaynaqlarını modern zamanın imkanları ilə gözdən keçirmək üçün insanlarımızın fəlsəfi düşüncə tarixinə müracaat etməsi zarurəti”* əsas prinsip kimi səsləndirilmişdir. Mənəviyyatı və əxlaqı dövlətin ünsürlərindən sayan fəlsəfə alimi Nurəddin Topçu belə qeyd edir: “*Əxlaq və mənəviyyat qaynağını dindən alır. Buna görə də axlaq İslam dininin əsası və bilavasitə özüdür. Əxlaqı dindən və ya dini əxlaqdan ayrı görmək istəyənlər, insanın daxili aləmini onun özündən ayrı görmək istəyənlərdir*” [Cevat Özyurt, 2017. s.200].

Bu fəlsəfi yanaşma ümummilli lider Heydər Əliyevin XXI əsrdə Azərbaycan xalqının bir xalq kimi formalaşmasında əsas meyar olduğunu rahatlıqla deyə bilərik. O deyirdi: *“Heç vaxt inamımızdan, dinimizdən uzaqlaşmayacağıq və bu mənəvi mənbələrimizdən istifadə edərək gələcəyimizi quracağıq!”* [21]. Bu başdan qeyd edək ki, Heydər Əliyevin Azərbaycan Respublikasının Prezidenti kimi yeni statusda fəaliyyəti ən mühüm səciyyəvi xarakteri milli-mənəvi dəyərlərimizin qorunması, adət-ənənələrimizin yaşadılması, klassiklərimizin yüzillərin sınağından günümüzə gəlib çatmış mənəvi irsinin gələcək nəsillərə itkisiz çata bilməsi üçün lazım olan bütün zəruri addımların atılması ilə izah edilə bilər. [Bahar Muradova, 08.05.2022].

Heydər Əliyev milli və mənəvi dəyərləri həmişə üstün tutmaqla mənəviyyat fəlsəfəsini klassik ənənə üzərinə qururdu. O, hər platformda fəlsəfi düşüncə tariximizin zəngin olduğunu və müasir imkanlar

möhtəvasında bunun əldə edilməsi və hayata kəçirilməsinin asan olduğunu vurğulayırdı. O bu haqda deyirdi: *“Azərbaycan əhalisinin çoxmilli tərkibi bizim sərvətimizdir, üstünlüyümüzdür... Dövlət, ölkə nə qədər çox xalqı birləşdirsə, bir o qədər zəngin olur, çünki onların hər biri ümumdünya mədəniyyətinə və sivilizasiyasına öz töhfəsini verir. Azərbaycan onun ərazisində yaşayan bütün millət və xalqların ümumi vətənidir. Azərbaycanlı sözü bizi həmişə birləşdirib”.* Heydər Əliyevin 13 avqust 2001-ci il tarixində tarixi-praktiki əhəmiyyətə malik olan bəyənatı ilə milli-mənəvi dəyərlərin qorunub saxlanmasının vacibliyini göstərirdi. Bu bəyənatda deyilirdi: “*Hər xalqın öz adət-ənələri, öz milli-mənəvi dəyərləri var. Biz öz milli-mənəvi dəyərlərimiz ilə fəxr edirik*” [Heydər Əliyev din və mənəvi dəyərlər haqqında. 2002. №1 (3)]. Ulu öndərimiz Heydər Əliyev türkdilli xalqların öz milli tarixlərini, doğma dillərini, ədəbiyyatlarını, mədəniyyət və incəsənətini, adət-ənənələrini qorumağı və onları zənginləşdirməyi həmişə dəstəkləmişdir. Bu baxımdan ümummilli lider Heydər Əliyev türkdilli ölkələrin mədəni əlaqələrini həyata keçirən Türksoy təşkilatının fəaliyyətinin genişlənməsinə və Azərbaycanın bu təşkilatın işində fəallıq göstərməsinə həmişə xüsusi diqqət yetirmişdir [Sakit Hüseynov, 2009. 9 dekabr. s.4].

O, gənclərin milli-mənəvi dəyərlər əsasında tərbiyələndirilməsində əsas amil kimi məhz həmin ənənənin böyük bir qaynaq olduğunu vurğulayırdı. Çıxışında deyirdi: *“...Biz öz milli-mənəvi dəyərlərimizi, adət-ənənələrimizi, əxlaqi dəyərlərimizi bütün istiqamətlərdə qorumalıyıq, saxlamalıyıq və gənc nəsli əsrlər boyu böyük sınaqlardan keçmiş bu mənəvi, əxlaqi dəyərlər ruhunda tərbiyələndirməliyik*” [Sakit Hüseynov, 2009. 9 dekabr. s.4].

Qeyd etmək lazımdır ki, Heydər Əliyev dünyagörüşündə mənəviyyat fəlsəfəsinin resusları klassik ənənə olmaqla yanaşı, milli dəyərlərin qorunub saxlanılmasında onların konservasiyası nəzərdə tutulmur burada varisliklə novatorluq vəhdət təşkil edir. Həmçinin o, klassik ənənə ilə müasirlik arasında mənəvi-ideoloji körpü yaradaraq millətin tarixi keçmişini gələcəyə uğurla addımlaması üçün etibarlı zəmin hesab etmişdir. Bakıda keçirilən “Müasirlik və dini mənəvi dəyərlər” mövzusunda beynəlxalq konfrans və Qafqaz müsəlmanlarının X qurultayı Qafqazda sülhün, əmin-amanlığın təhlükəsizliyin və əməkdaşlığın təmin olunmasında müstəsna əhəmiyyət kəsb etmişdir. Heydər Əliyev keçirilmiş hər iki tədbiri Qafqaz müsəlmanlarının daha sıx birləşməsi, dayaq olması üçün böyük bir mərhələ hesab etmişdir. [Hüseynova, İ. 2008. s.566].

**4.Nəticə**

Hər bir ictimai formanın özünəməxsus mənəviyyat fəlsəfəsi və prinsipləri mövcuddur. Çünki mənəviyyat fəlsəfəsindən çıxış edərək həyatda qalma

başarısı toplumların varlıq səbəbidir. Onların mövcudiyyəti, yaxud həyatda varlıq göstərmələrinin zəruriliyi dəyərlər komponentindən kompleks formada istifadə etməkdir. Mənəviyyat fəlsəfəsi toplumların, yaxud ictimai quruluşların təkcə ayaqda qalmaları yox, həm də onların gələcəyi üçün bir ehtiyacdır. Sosial münasibətlərin qurulmasında insanlararası münasibətləri tənzimləyən dəyərlər və normlar ictimai həyatda insanın manəviyyat fəlsəfəsini təşkil edir. Müasir insan modeli, yaxud şəxsiyyəti üçün bu ehtiyacı təmin edən qaynaq insanın yaşadığı cəmiyyətin tarixi, ədəbiyyatı, mədəni-dini ənənəsidir. Həmin mədəni-dini ənənə xalqların kökündə duran ünsürləri ehtiva edir və həmişə milli mənsubiyəti və milliliyi özündə əks etdirir. Hər bir fərd həmin ənənədən bəhrələnərək özünü ifadə etdiyi kimi, qarşılaşdığı müşkil durumlarda da referans kimi məhz həmin qaynağa müraciət edir.

Məhz bu səbəblədir ki, türk dünyasında ümumiyyətlə son dövrlərdə "*mənəviyyatın ənənəvi qaynaqlarını modern zamanın imkanları ilə gözdən keçirmək üçün insanlarımızın fəlsəfi düşüncə tarixinə müracaat etməsi zarurəti"* əsas prinsip kimi səsləndirilmişdir. Bu fəlsəfi yanaşma ümummilli lider Heydər Əliyevin XXI əsrdə Azərbaycan xalqının bir xalq kimi formalaşmasında əsas meyar olduğunu rahatlıqla deyə bilərik. O deyirdi: *"Heç vaxt inamımızdan, dinimizdən uzaqlaşmayacağıq və bu mənəvi mənbələrimizdən istifadə edərək gələcəyimizi quracağıq!"* Heydər Əliyevin Azərbaycan Respublikasının Prezidenti kimi yeni statusda fəaliyyəti ən mühüm səciyyəvi xarakteri milli-mənəvi dəyərlərimizin qorunması, adət-ənənələrimizin yaşadılması, klassiklərimizin yüzillərin sınağından günümüzə gəlib çatmış mənəvi irsinin gələcək nəsillərə itkisiz çata bilməsi üçün lazım olan bütün zəruri addımların atılması ilə izah edilə bilər. Nəticə olaraq qeyd edə bilərik ki, Heydər Əliyev milli və mənəvi dəyərləri həmişə üstün tutmaqla mənəviyyat fəlsəfəsini klassik ənənə üzərinə qururdu. O, hər platformda fəlsəfi düşüncə tariximizin zəngin olduğunu və müasir imkanlar möhtəvasında bunun əldə edilməsi və hayata kəçirilməsinin asan olduğunu vurğulayırdı.

## ƏDƏBİYYAT

**1.** Seyyar, A. (1999). *Sosyal Hizmet Terimleri* (Ansiklopedik 'Sosyal Çalışma' Sözlüğü). Sakarya Yayıncılık, Sakarya pp.100-125.
**2.** Yapıcı, A. (2023). "*Öğretmen Adaylarının Değerler Yönelimleri*", www.esosder.org, Güz-2012, cild:11, sayı: 42. (01.02.2023)
**3.** Lewis, B. (2020). *Çatışan kültürler* (Tərcümə edən: Nurettin Elhüseyni) Ankara, s 79.

**4.** Özyurt, C. (2017). *Nurettin Topçu'nun din kuramı ve İslam yorumu*. Türkiyede sosyal teoride din, Ankara. s.200
**5.** Özkalp, E. (2003). “*Kültür*”, Davranış Bilimlerine Giriş, Editör. Enver Özkalp vd., Eskişehir. Anadolu Üniversitesi Yay, Eskişehir, s 21.
**6.** *Əbu Turxanın hikmət dünyası,* http://www.anl.az/down/meqale/525/2012/mart/238335.htm (31.01.2023)
**7.** *Heydər Əliyev din və mənəvi dəyərlər haqqında*. Dini Qurumlarla İş Üzrə Dövlət Komitəsinin bülleteni. 2002.№1 (3)
**8.** Tepe, H. (2009). Değer ve anlam: Değerler anlamlar midir? *Felsefe ve sosyal bilimler dergisi*, *7*. s.26
**9.** Kutluer, İ. (2000). “*İnsan*”, Diyanet İslam Ansiklopedisi. İstanbul, s 320-323.
**10.** Hüseynova, İ. (2008). *Heydər Əliyev və Qafqazda sülh prosesi*, Bakı, s.556.
**11.** Buscaglia, L. (1987). *Kişilik tümüyle insan olabilme sanatı*, (Tərcümə: N. Ebcioğlu), İstanbul, s.35.
**12.** Yazıcı, M. (2014). Değerler ve toplumsal yapıda sosyal değerlerin yeri, *Fırat Universiteti Soyal Bilimler Dergisi 24(1).* Elazığ. s. 212.
**13.** Nirun, N. (1991). *Sistematik Sosyoloji Yönünden Sosyal Dinamik Bünye Analizi*. Atatürk Kültür Merkezi Yayınları, Ankara, s.107.
**14.** Küçük, O. N. (2015). *Mevlanaya görə manevi gelişim*. İstanbul, s.15
**15.** Yazoğlu, R. (2014). Ebul-hasan Harakanide hoşgörü ve insan sevgisi, *Kafkas Üniversitesi İlahiyat Fakültesi Dergisi 1*. Kars, s. 6-15.
**16.** Hüseynov, S. (2009). Heydər Əliyev və milli-mənəvi dəyərlərimiz. *Xalq qəzeti*, 9 dekabr. səh. 4, http://anl.az/down/meqale/xalqqazeti/xalqqazeti_dekabr2009/98711.htm.
**17.** Muradova, B. *Heydər Əliyev idealogiyası milli-mənəvi özünüdərk müstəvisində*, Azərbaycan rəsmi dövlət qəzeti, 08.05.2022, https://www.azerbaijan-news.az/az/posts/detail/heyder-eliyev-ideologiyasi-milli-menevi-deyerler-ve-milli-ozunuderk-mustevisinde-1651963977, (02.02.2023)
**18.** http://anl.az/down/meqale/xalqqazeti/xalqqazeti_dekabr2009/98711.htm
**19.** http://www.anl.az/down/meqale/525/2012/mart/238335.htm
**20.** http://anl.az/el/emb/H.Aliyev/H.E._kelamlar.htm

# Роль духовных ценностей в обществе и философия нравственности Гейдара Алиева

**Ахмад Ниязов***

**Абстракт.** Человек должен поддерживать связь между материальным и духовным мирами, а также выстраивать и продолжать гармонию между ними. В связи с этим, важным является присутствие в человеке философии нравственности. Потому что духовные ценности являются фанусом замыслов и раздумий, индивида к обществу, государства к истории, экономического порядка к искусству и религии.

Ценности и нормы, которым люди обязаны подчиняться в построении социальных отношений составляют философию нравственности человека в общественной жизни. Для современной человеческой модели человека, или личности эта основа, удовлетворяет также является исторической, литературной и культурно-религиозной традицией. Согласно высказываниям известного историка Бернарда Левиса: «Поскольку в истории человечества такие политические идеологии как - социализм, капитализм, ничего не предоставили человеку в желаемой форме, люди XXI века будут искать счастье в своих исторических корнях». Именно поэтому в целостности в тюркском мире в последнее время основным принципом является «прослеживание традиционных источников духовности, сочетая их с современными возможностями, а также необходимость обращения наших людей к истории философского мышления». Ученый- философ Нуреддин Топчу, считающий духовность и нравственность элементами государства отмечает: «Мораль и нравственность основываются на религию. Поэтому мораль является основой Исламской религии и возможно, самою ею. Те, кто хочет отделиться от религии или религиозной морали, хотят отделить человеческий внутренний мир от самого себя». С уверенностью можно сказать, что этот философский подход являлся главным критерием общенационального лидера Гейдара

* Доктор философии по теологии, доцент,
Заведующий кафедрой «Исламоведения» Азербайджанского Института Теологии; Баку, Азербайджан
E-mail: ahniyazov@hotmail.com
https://orcid.org/0000-0001-8164-2184
**Цитировать статью:** Ниязов, А. [2023]. Роль духовных ценностей в обществе и философия нравственности Гейдара Алиева. *Журнал «Metafizika», 6(1),* с.185-197.

**История статьи:**
*Статья поступила в редакцию: 20.01.2023*
*Отправлена на доработку: 21.02.2023*
*Принята для печати: 13.03.2023*

Алиева, внедрившего данное понятие в XXI веке в формирование азербайджанского народа.

Он говорил: «Мы никогда не отдалимся от веры, религии и используя эти духовные ресурсы построим наше будущее!». На каждой платформе он как лидер, такими и другими лозунгами особо высказывался о богатой истории философского мышления, о его легком усвоении, благодаря современным возможностям претворении их в жизнь. В статье отражен контекст - философия нравственности и Гейдар Алиев.

**Ключевые слова:** человек, нравственность, Гейдар Алиев, контекст, цивилизация, религия

## The role of spiritual values in society and Heydar Aliyev's philosophy of spirituality

**Ahmad Niyazov***

**Abstract.** A person should establish a connection between both his material and spiritual worlds and maintain this harmony by establishing harmony between these two worlds. In this sense, a person must have a philosophy of spirituality. Because moral values stand like a beacon above the ideas and thoughts that extend from the individual to the society, from the state to history, from economic order to art and religion.

The values and norms that people have to obey in the establishment of social relations constitute the moral philosophy of a person in public life. The source that satisfies this need for a modern human model or personality is the history, literature, cultural and religious tradition of the society in which a person lives. As the famous historical scholar Bernard Lewis said: "In human history, political ideologies such as socialism and capitalism have not offered anything to man in the desired form, so the man of the 21st century will look for his happiness in his historical roots". It is for this reason that in the Turkish world in recent times, "the need for our people to turn to the history of philosophical thought in order to review the traditional sources of spirituality with the possibilities of modern times" has

* Doctor of Philosophy in Theology, Associate Professor,
Head of “Department of Islamic studies”, Azerbaijan Institute of Theology; Baku, Azerbaijan
E-mail: ahniyazov@hotmail.com
https://orcid.org/0000-0001-8164-2184

**To cite this article:** Niyazov, A. [2023]. The role of spiritual values in society and Heydar Aliyev's philosophy of spirituality. *“Metafizika” journal, 6(1),* pp.185-197.

**Article history:**
*Received: 20.01.2023*
*Accepted: 13.03.2023*

been voiced as the main principle. Nurettin Topcu, a philosopher who considers spirituality and morality to be one of the elements of the state, says: says: "Morality and spirituality take their source from religion. Therefore, morality is the basis and direct essence of the Islamic religion. Those who want to separate morality from religion or religion from morality are those who want to see the inner world of a person separate from himself".

We can easily say that this philosophical approach was accepted by the national leader Heydar Aliyev as the main criterion for the formation of the Azerbaijani people as a nation in the 21st century. He was saying: "We will never depart from our faith and religion and we will build our future using these spiritual resources!" As a leader with one or another slogan, he emphasized that our history of philosophical thought is rich in every platform and that it is easy to achieve and implement it in the context of modern possibilities. The article reflects the philosophy of spirituality in general and the context of Heydar Aliyev.

**Keywords*:*** man, spirituality, Heydar Aliyev, context, civilization, religion

## REFERENCES

1. Seyyar, A. (1999). *Social Service Terms* (Encyclopedic 'Social Work' Dictionary). Sakarya Publishing House, Sakarya pp. 100-125.
2. Yapıci, A. (2023). "*Value Orientations of Teacher Candidates*", www.esosder.org, Fall-2012, volume: 11, number: 42. (02.01.2023).
3. Lewis, B. (2020). *Missing Cultures* (Translator: Nurettin Elhuseyni) Ankara, p. 79.
4. Ozyurt, C. (2017). *Nurettin Topçu's theory of religion and interpretation of Islam.* Religion in social theory in Turkey, Ankara. p.200.
5. Ozkalp, E. (2003). "*Culture*", Introduction to Behavioral Sciences, Ed. Enver Özkalp vd., Eskişehir. Anadolu University Summer, Eskişehir, p.21.
6. *The world of wisdom of Abu Turkhan,* http://www.anl.az/down/meghale/525/2012/mart/238335.htm (31.01.2023)
7. Heydar Aliyev on religion and moral values. *Bulletin of the State Committee on Work with Religious Institutions. 2002. No. 1 (3).*
8. Tepe, H. (2009). Value and Meaning: Are Values Meanings? *Journal of Philosophy and Social Sciences, 7.* p.26.
9. Kutluer, I. (2000). "*Human*", Diyanet Islamic Encyclopedia. Istanbul, pp. 320-323.
10. Huseynova, I. (2008). *Heydar Aliyev and the peace process in the Caucasus.* Baku, p.556.

11. Buscaglia, L. (1987). *Masculinity is the art of being fully human*, (Translation: N. Ebcioglu), Istanbul, p.35.
12. Yazıcı, M. (2014). Values and the place of social values in the social structure. *Fırat University Soyal Bilimler Journal 24(1).* Elazig. etc. 212.
13. Nirun, N. (1991*). Systematic Sociological Analysis of Social Dynamic Structure. Atatürk Cultural Center Publications*. Ankara, p.107.
14. Küçük, O. N. (2015). *Spiritual development according to Mevlana.* Istanbul, p.15.
15. Yazoglu, R. (2014). Tolerance and human love in Ebul-hasan Harakan, *Kafkas University Faculty of Theology Journal 1*. Kars, pp.6-15.
16. Huseynov, S. (2009). Heydar Aliyev and our national and moral values. *Khalq newspaper*, December 9, p.4. http://anl.az/down/megale/xalqqazeti/xalqqazeti_dekabr2009/98711.htm.
17. Muradova, B. *Heydar Aliyev's ideology at the level of national-moral self-awareness.* official state newspaper of Azerbaijan, 08.05.2022, https://www.azerbaijan-news.az/az/posts/detail/heyder-eliyev-ideologiyasi-milli-menevi-deyerler-ve-milli-ozunuderk-mustevisinde-1651963977, (02.02.2023)
18. http://anl.az/down/megale/xalqqazeti/xalqqazeti_dekabr2009/98711.htm
19. http://www.anl.az/down/megale/525/2012/mart/238335.htm
20. http://anl.az/el/emb/H.Aliyev/H.E._kelamlar.htm